UOT: 336:336.01

# FERMER TƏSƏRRÜFATLARINDA MALİYYƏLƏŞMƏ MEXANİZMİNİN ƏSAS XÜSUSİYYƏTLƏRİ

**Ə. Ə. DADAŞOV**
**Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)**

*Məqalədə fermer təsərrüfatlarının fəaliyyətinin istiqamətləri açıqlanmış, onun maliyyələşməsi xüsusiyyətləri və maliyyələşmə mexanizmində qarşıya çıxan problemləri araşdırılmışdır. Eləcə də, bir sıra inkişaf etmiş ölkələrdə fermer təcrübəsi, fermer təsərrüfatlarının maliyyələşməsi mexanizmləri qısa olaraq açıqlanmışdır. Məqalənin yekununda fermer təsərrüfatlarının maliyyələşməsi problemlərinin həllinin zəruriliyi vurğulanmış və onların həlli istiqamətində müəllif tərəfindən təkliflər irəli sürülmüşdür.*

***Açar sözlər:*** *fermer təsərrüfatı, maliyyələşmə mexanizmi, kredit vəsaiti, subsidiya, dotasiya, vergi güzəştləri, investisiya, sığorta sistemi.*

Fermer təsərrüfatlarının yaradılması və onların səmərəli fəaliyyətinin təmin edilməsi, təsərrüfatların ölçülərinin fermerlərin məqsədləri baxımından tələb olunan səviyyəyə çatdırılmasını, bütövlükdə aqrar-sənaye kompleksində əsaslı struktur dəyişiklikləri aparılmasını, maddi-texniki təchizatın, iş və xidmətlərin daha səmərəli formalarının tətbiq edilməsini və eləcə də fermer təsərrüfatlarında maliyyələşmə mexanizmlərinin təkmilləşdirilməsini aktual məsələyə çevirir. Azərbaycan Respublikası Prezidentinin 06.12.2016 tarixli fərmanı ilə qəbul edilmiş "Kənd təsərrüfatı məhsulları istehsalına və emalına dair Strateji Yol Xəritəsi"ndə ölkədə rəqabət qabiliyyətli kənd təsərrüfatı sektoru formalaşdırmaq üçün istehsalçıların və eləcə də fermer təsərrüfatlarının maliyyə resursları ilə təminatının yaxşılaşdırılması, bu sahədə risklərin qiymətləndirilməsi və habelə bu risklərin azaldılması, təsirinin yumşaldılması üzrə mexanizminin təkmilləşdirilməsinin zəruriliyi qeyd edilir. Bütün bunlar isə dövlətin çevik vergi mexanizminin əlverişli maliyyə-kredit, sığorta mexanizminin formalaşdırılmasını, məqsədli dövlət subsidiyalaşdırılmasını, fermer təsərrüfatlarına böyük həcmdə investisiya qoyuluşları proqramlarının hazırlanıb həyata keçirilməsini tələb edir. [1]

**Azərbaycandakı fermer təsərrüfatlarının fəaliyyətinin mövcud vəziyyətinin qiymətləndirilməsi**

Azərbaycan Respublikası Dövlət Statistika Komitəsinin 1 iyun 2005-ci il vəziyyətinə siyahıyaalınına məcmuələrində qeyd olunur ki, "Kəndli (fermer) təsərrüfatı əsasən şəxsi əməyə əsaslanmaqla mülkiyyətində və ya icarəsində olan torpaq və mülkdə kənd təsərrüfatı məhsullarının istehsalı, emalı və satışı ilə məşğul olan və hüquqi şəxs kimi rəsmi qeydiyyatdan keçmiş təsərrüfatçılıq formasıdır." Kəndli (fermer) təsərrüfatı tək şəxs və ya ailə ola bilər. [3]

"Ailə-kəndli təsərrüfatı" haqqında Azərbaycan Respublikası Qanununun qəbul edilməsi ilə əlaqədar hazırda kəndli (fermer) təsərrüfatları sahibkar təsərrüfatları hesab olunurlar. [3] Göründüyü kimi, kəndli (fermer) təsərrüfatları (hazırda bunlar fərdi sahibkar təsərrüfatları adlanır) deyərkən hüquqi şəxs kimi qeydiyyatdan keçmiş tək şəxsin və ya ailənin təsərrüfatı nəzərdə tutulmalıdır. Lakin, araşdırmalar göstərir ki, istər siyahıyaalma ilinin əvvəlinə, istər ondan əvvəlki və istərsə də hazırda Statistika Komitəsinin məcmuələrində göstərilən fərdi sahibkar təsərrüfatlarının böyük əksəriyyəti tək şəxsə və ya bir ailəyə məxsus deyil. Belə ki, torpaq islahatı nəticəsində 867773 kəndli ailəsi toıpaq mülkiyyətçisi olmuşdur. Bu ailələrdən 14232-si 1163 kollektiv müəssisə, 1057-si 164 kənd təsərrüfatı istehsalı kooperativi 985-i 374 kiçik müəssisə, 518-i 107 sair özəl kənd təsərrüfatı müəssisəsi təsis etmiş, təqribən (respublika üzrə orta hesabla bir kəndli ailəsinə düşən torpaq payına istinad etməklə) 10392 kəndli ailəsi 2599 kəndli (fermer) təsərrüfatı yaratmış, qalan 840589 kəndli ailəsi ailə-kəndli təsərrüfatı formasında fəaliyyət göstərir. Belə ki, kənd təsərrüfatı istehsalçılarının 66,8% ailə-kəndli, 32,8%-i ev təsərrüfatları, 0,2%-i isə kəndli (fermer) təsərrüfatları təşkil edir.

Dövlət Statistika Komitəsinin "Kənd təsərrüfatı müəssisələrinin və fərdi sahibkar təsərrüfatlarının əsas iqtisadi göstəriciləri" məcmuəsində qeyd olunmuş torpaq sahəsinə dair göstəricilər də bu fikri təsdiqləyir. Belə ki, 2005-ci ildə respublika üzrə 2681, 2010-cu ildə 2618, 2015-ci ildə isə 1534 fərdi sahibkar təsərrüfatı qeydə alınmışdır. Uyğun olaraq, bu təsərrüfatların kənd təsərrüfatına yararlı torpaq sahəsi 22577, 45735 və 32530 hektar, o cümlədən əkin yeri

16112, 33764 və 23379 hektar, məhsul istehsalında iştirak edən ailə üzvlərinin sayı 11474, 10536 və 5973 nəfər, kənardan cəlb edilmiş işçilərin sayı isə 2059, 2311 və 1800 nəfər olmuşdur. Bir təsərrüfata orta hesabla 8,4, 17,5 və 21,2 hektar yararlı torpaq sahəsi düşür. Göstərilən tarixə respublikada 2598 fərdi kəndli (fermer) təsərrüfatı olmuşdur. Onların mülkiyyətində 18692 ha kənd təsərrüfatına yararlı sahə, o cümlədəndə 15790 ha əkin yeri olmuşdur ki, bu da 1 təsərrüfata orta hesabla 7,2 ha yararlı sahə deməkdir. Bundan əlavə bu təsərrüfatların icarə və istifadəsində 24475 ha yararlı torpaq sahələri olmuşdur ki, bu göstərici 1 təsərrüfata düşən yararlı sahənin hesablanmasında iştirak etməmişdir. [2]

Kənd təsərrüfatının sosial və sahəvi tərkibində əsaslı dəyişikliklər baş vermişdir. İri təsərrüfat formalarının əvəzində müxtəlif mənsubiyyətli çoxsaylı təsərrüfat subyektləri yaradılmış, geniş miqyaslı özəlləşdirmə siyasətinə uyğun olaraq, kənd təsərrüfatına yararlı torpaq sahələri, mal-qara, istehsal və qeyri- istehsal obyektləri, kənd təsərrüfatı texnikası üzərində dövlət mülkiyyət forması fərdi (şəxsi) mülkiyyətlə əvəz edilmişdir. Kənd təsərrüfatı istehsalçılarının sayı 1208,7 min vahidlə xarakterizə edilir. Bu istehsalçıların 99,98 faizi özəl, 0,02 faizi isə dövlət təsərrüfatlarmdan ibarətdir. Bundan əlavə, 78648 müxtəlif növ kənd təsərrüfatı məhsulları istehsalı, emalı və satışı ilə məşğul olan bağ evi təsərrüfatları mövcuddur. İxtisaslaşdırılmış kənd təsərrüfatı istehsalçılarının 66,8 faizi ailə kəndli, 32,8 faizi ev təsərrüfatları, 0,2 faizini isə kəndli (fermer) təsərrüfatları təşkil edir. [2]

**Fermer təsərrüfatlarının maliyyə təminatı və maliyyələşmə mexanizminin xüsusiyyətləri**

Təsərrüfat mühitində ən mühüm məsələ maliyyə təminatı və təsərrüfatın maliyyə mexanizmi hesab olunur. Maliyyə təminatı maliyyə mənbələrinin əhatəliliyi və çoxşaxəliliyi ilə təsərrüfatın geniş təkrar istehsalının fasiləsizliyinə və davamlılığına bilavasitə təsir göstərir. Belə ki, maliyyələşmə mənbələri nə qədər diversifikasiyaya məruz qalarsa, geniş təkrar istehsalın fasiləsizliyi bir o qədər təmin olunar, eyni zamanda rentabellik (ümumi, xərc) və səmərəlilik göstəriciləri də yüksələ bilər.

Təsərrüfatın maliyyə mexanizmi anlayışı özündə təkcə təsərrüfat vahidinin maliyyələşmə mənbələri deyil, həm də maliyyə çıxışının asanlaşdırılması yolları, maliyyə nəzarəti sistemi, maliyyə planlaşdırılması, proqnozlaşdırılması və maliyyə qanunvericiliyini (maliyyə məsələləri üzrə normativ hüquqi baza) də əhatə edir.

Təsərrüfatı ənənəvi maliyyələşdirmə mənbələrinə aşağıdakılar aid olunur:

* təsərrüfatın xüsusi vəsaitləri yə ya ilkin kapital yığımı;

* kredit vəsaitləri;

* dövlət yardımı əsasında büdcə köçürməsi xətti ilə ayrılmış pul vəsaitləri;

* müddətli öhdəlik qaydasında digər təsərrüfat vahidlərindən cəlb olunınuş borc kapitalı;

* beynəlxalq maliyyə-kredit təşkilatlarından alınan vəsait (kredit, investisiya və s). [6]

Fikrimizcə, aqrar sahədə təsərrüfatçılığın maliyyə-kredit mexanizminin hər bir elementinin ayrı-ayrılıqda tədqiq edilməsi bu sahədə elmi cəhətdən əsaslandırılmış praktik əhəmiyyətli təkliflərin işlənilib hazırlanınasına imkan verə bilər. Hesab edirik ki, ixracatçı fermer təsərrüfatlarının maliyyələşmə mexanizminin təkmilləşdirilməsi zamanı əsas etibarilə aşağıdakı prinsiplər əsas götürülməlidir:

* bazar özünütənzimləməsinin əsas elementləri olan tələb və təklif arasında iqtisadi müvazinətin qorunub saxlanılması;

* təsərrüfat subyektlərinin iqtisadi müstəqilliyinin təminatı;

* təsərrüfat subyektlərinin bazar konyunkturasında baş verən neqativ təsirlərdən, dəyişikliklərdən effektiv şəkildə kompensasiyası və sığortalanması;

* təsərrüfat subyektlərinin maddi-texniki resurslara olan ehtiyacının ödənilməsi məqsədilə zəruri maliyyə yardımların göstərilməsi;

* ixrac potensiallı təsərrüfat subyektlərinin maliyyə çıxışının asanlaşdırılması;

* yanacaq-enerji daşıyıcılarının qiymətlərinin artımı ilə bağlı təsərrüfat subyektlərinin üzləşdikləri zərərlərin kompensasiya edilməsi və eləcə də, əmtəə istehsalçılarına subsidiyaların verilməsi.

**Fermer təsərrüfatlarında maliyyələşmə mexanizminin dünya təcrübəsi**

İnkişaf etmiş ölkələrin təcrübəsi onu göstərir ki, fermer təsərrüfatlarının maliyyə mexanizminin təkmilləşdirilməsi ilk növbədə istehsalçı və xüsusilə də, ixrac potensialına malik olan fermer təsərrüfatlarının subsidiyalaşdırılmasına əlverişli şərait yaradılmasına xidmət edir. Uzun müddət fermer təcrübəsinə malik Avropa ölkələrində də fermer təsərrüfatları zaman keçdikcə, dövrün tələblərinə uyğun olaraq kiçik ölçülü təsərrüfatlar birləşmiş, iri təsərrüfatlar yaranmışdır. Lakin, yenə də təsərrüfatların böyük əksəriyyətində əkin sahələri 10 hektardan azdır. Ümumi Avropa üzrə 2014-cü ilin məlumatlarına əsasən, kənd təsərrüfatına yararlı sahələrin 69,1%-i 10 hektaradək, 27,6%-i 10-100 hektar arası, 3,2%-i 100 hektardan çox sahələr təşkil edir. Ayrı-ayrı ölkələrdə fermer təsərrüfatlarında kənd təsərrüfatına yararlı sahələrin 10 hektarınadək ölçüdə olanları ən çoxu Yunanıstanda (90,4%), Portuqaliyada (87,8%) və İtaliyadadır (87,5%). 10-100 hektar ölçüdə kənd təsərrüfatına yararlı sahəsi çox olanlara İslandiya (77,2%), Finlandiya (74,4%), Danimarka (71,3%) aiddir. 100 hektar və ondan çox kənd təsərrüfatına yararlı sahəsi olan ölkələrə Böyük Britaniyada (16,5%), İslandiya

(11,2%) və Danimarka (8,8%) daxildir. Türkiyədə fermer təsərrüfatlarının 82%-nin torpaq sahələrinin ölçüsü 10 hektaradəkdir. Yaponiyada fermer təsərrüfatlarının 97%-dən çoxu 5 hektaradək torpaq sahəsinə malikdir. Bu baxımdan fermer təsərrüfatlarının maliyyə təminatında büdcə yardımları önəmli rol oynayır. [12]

**Cədvəl.** Fermer təsərrüfatlarının orta ölçüsü

| **Ölkələr** | **Fermer** |
|---|---|
| Danimarka | 57,6 |
| Almaniya | 48,3 |
| Polşa | 7,0 |
| Slovakiya | 45,5 |
| Macarıstan | 8,7 |

Mənbə: "Təsərrüfat subyektlərinin səmərəli fəaliyyətinin iqtisadi mexanizmi" monoqrafiya, N.M.Əlibəyov, Bakı 2014.

Fikrimizcə, inkişaf etmiş dövlətlərin fermer təsərrüfatlarına maliyyə yardımı göstərilməsi sahəsindəki təcrübədən yan keçməməli, əksinə təcrübəni öyrənib respublikanın aqrar bölməsinə tətbiq etmək, kənd təsərrüfatının dinamik inkişafına nail olmaq mümkündür.

Fermer təsərrüfatlarını maliyyə təminatı xüsusi diqqət tələb edən məsələdir. Cari problem daha çox kiçik ölçülü əmtəə istehsalçılarında gəlirliliyinin az olması əl əməyinə əsaslanan, kənd təsərrüfatı məhsullarının qiymətinin aşağı səviyyəsi və eləcə də bazarda məhsul bolluğunun yaranınası kimi sıralanır. Həmçinin verilmiş kredit vəsaitlərinin əkin sahəsinə yönəldilməsi də buna aid edilir. Yaxın zamanlarda qəbul edilmiş dövlət prioritetlərinin kiçik fermer təsərrüfatlarının maliyyə dayanıqlığının, effektivliyinin yüksəldilməsi hələ də qənaətbəxş səviyyədə deyil.

## NƏTİCƏ

Fermer təsərrüfatlarının maliyyələşmə mexanizminin tədqiq edilməsi nəticəsində belə bir qənaətə gəlirik ki, ölkədə fermer təsərrüfatlarının mövcud maliyyə vəziyyəti çətindir və kənd təsərrüfatı böhrandan çıxarılması üçün aqrar iqtisadiyyata dövlət müdaxiləsi, dövlət dotasiyası və yardımı, güzəştli vergi və kredit sisteminin tətbiqi tələb olunur. Ölkənin kənd təsərrüfatına xarici və daxili investorların yüksək həcmdə investisiya yatıracaqlarının qeyri-real olduğunu nəzərə alaraq xarici və daxili investorların səylərini ilk növbədə yüngül və yeyinti sənayesinin inkişafına yönəldilməsini məqsədəuyğun hesab edir.

Qeyri-neft sektorunun diversifikasiyalı inkişafının zəruri olduğu şəraitdə fermer təsərrüfatlarında ənənəvi maliyyələşmə mexanizminin aşağıdakı istiqamətdə formalaşması həm kənd təsərrüfatı əmtəə istehsalçılarının gəlirlərinin artmasına və həm də ölkənin ərzaq təhlüksizliyinin təmin edilməsinə əlverişli şərait yarada bilər:

- mülkiyyət formasından asılı olmayaraq fermer təsərrüfatlarına büdcə təxsisatlarının verilməsi hesabına daxili kənd təsəırüfatı və ərzaq məhsulları bazarında yerli istehsalın xüsusi çəkisinin artırılması;
- zərərlə işləyən fermer təsərrüfatlarının təminatlı gəlirlərini formalaşdırmaq məqsədilə maliyyələşmə, kreditləşmə, güzəştli vergi, sığorta sisteminin tətbiqi;
- daxili və xarici bazarda milli fermer təsərrüfatlarının iqtisadi vasitələrlə rəqabətqabiliyyətinin qorunması.

Ənənəvi maliyyələşmə mexanizmi fermer təsərrüfatlarımn istər ölkədaxili, istərsə də ölkəxarici bazarın zərərli təzahürlərindən, xüsusilə də maliyyə problemlərindən qorunmasına xidmət etməlidir. Fermer təsərrüfatlarının maliyyələşmə mexanizminin təkmilləşdirilməsi məqsədilə aşağıdakı tədbirlərin həyata keçirilməsini təklif edirik:

- fermer təsərrüfatlarında çalışan işçilərin gəlirlilik səviyyəsi arasında paritetin formalaşmasına yardım göstərilməsi;
- fermer təsərrüfatlarına investisiya məqsədləri üçün büdcədən subsidiyalar verilməsinə dair uzunmüddətli dövlət proqramları hazırlayıb həyata keçirmək;
- fermer təsərrüfatı subyektlərinin gəlirlərindən dövlət tərəfindən müəyyən edilmiş ölçüdə məqsədli ayırmalardan yardım üçün büdcədənkənar fondların yaradılması və onlar hesabına təsərrüfatlara yardım göstərilməsi;
- fermer təsərrüfatlarının kreditləşmə əməliyyatları həyata keçirən bank, bank olmayan kredit təşkilatları və kredit ittifaqlarına vergi güzəştlərinin müəyyən edilməsi;
- bazar iqtisadiyyatının tələblərinə müvafiq sığorta mexanizminin tətbiq edilməsi.

Fermer təsərrüfatlarında ənənəvi maliyyələşməsi mexanizmləri ilə yanaşı innovativ maliyyələşmə mexanizmləri ilə bağlı da biliklərin az olması bu sahəyə marağın yetərincə olmamasına səbəb olur. Bununla əlaqədar risk faktoru olaraq da ölkədəki kredit təşkilatların fermer təsərrüfatların kredit verməkdə az maraqlı olması kimi özünü büruzə verir.

## ƏDƏBİYYAT

**1.** "Kənd təsərrüfatı məhsullarının istehsalı və emalına dair" Strateji Yol Xəritəsi. Bakı 2016. **2.** Azərbaycan Respublikası Dövlət Statistika Komitəsinin "Kənd təsərrüfatı müəssisələri və fərdi sahibkar təsərrüfatları əsas iqtisadi göstəriciləri" məcmuəsi. Bakı 2016. **3.** "Ailə kəndli təsərrüfatı haqqında" AR qanunu, Bakı 2005. **4.**"Aqrar sahənin iqtisadiyyatı" monoqrafiya, İ.H.İbrahimov, Bakı 2016. **5.**"Təsərrüfat subyektlərinin səmərəli fəaliyyətinin iqtisadi

mexanizmi” monoqrafiya, N.M.Əlibəyov, Bakı 2014. **6**.“Aqrar sahənin dayanıqlı inkişaf problemləri” monoqrafiya, S.V.Salahov, Bakı 2012. **7**.“Aqrar sahədə iqtisadi tənzimlənməsinin aktual problemləri” monoqrafiya, V.H.Abbasov, Bakı 2012. **8**“Aqrar sahənin dövlət tənzimlənməsi problemlər” monoqrafiya, S.V.Salahov, Bakı 2004. **9**. stat.gov.az. **10.** agro.gov.az. **11**. agroeconomy.az. **12.** data.worldbank.org

## Основные особенности механизма финансирования в фермерских хозяйствах

**А. А. Дадашов**

В статье раскрыты направления деятельности фермерских хозяйств, исследованы особенности ее финансирования и проблемы, возникающие в механизме финансирования. Наряду с этим, также кратким образом раскрыты механизмы финансирования фермерских хозяйств и фермерский опыт некоторых развитых стран. В заключении статьи отмечена необходимость разрешения проблем финансирования фермерских хозяйств и в направлении их решения со стороны авторы выдвинуты предложения.

**Ключевые слова:** фермерское хозяйство, механизм финансирования, кредитное средство, субсидия, дотация, налоговые льготы, инвестиция, страховая система.

## Main features of the traditional financing mechanism in farms

**A. A. Dadashov**

Activity directions of farms are disclosed, their funding features and the confused problems in financing mechanism are investigated in this article. As well as, farmers experience in some developed countries and financing mechanism in farms are briefly described. Finally, the necessity of solving the financing problems of the farms and well-founded suggestions in the direction of their solution are nominated by author at the end of this article.

***Key words***: farming, financing mechanisms, credit, subsidies, tax deductions, investment, insurance.